İQTİSADİYYAT VƏ İQTİSADİ MÜNASİBƏTLƏR

Azərbaycan Aqrar Elmi 2 2018 Аграрная Наука Азербайджана

UOT: 336. 714

# SOSİAL SAHƏLƏRİN İNVESTİSİYA TƏMİNATININ YENİ MEXANİZMLƏRİ (TURİZM SEKTORUN TİMSALINDA)

**A. N. EMİNOV**
**Azərbaycan Turizm və Menecment Universiteti**

*Turizm sektorunda investisiya qoyuluşu xüsusilə Azərbaycanda idman oyunlarının və digər geniş miqyaslı siyasi və idman tədbirlərinin həyata keçirilməsində, ölkənin rəhbərliyi tərəfindən yeni obyektlərin qurulması, mövcud turizm mərkəzlərinin infrastrukturunun inkişaf etdirilməsi və sərgi mərkəzlərinin yaradılmasına götərilən diqqətdə özünü biruzə verir. Turizm sahəsində investisiya fəaliyyətinin iştirakçıları bu sektorda makro və mikro səviyyələrdə maksimum müsbət sosial və iqtisadi nəticə əldə etməyi nəzərdə tutan kapitalın yığılması, transformasiyası, yerləşdirilməsi, investisiya yatırımı prosesləri ilə əlaqəlidir. Bu məqalədə əsasən sosial sahələrə qoyunlan investisiyaların təminatı və qoyulan investisiyaların effektivlik promlemləri araşdırılmışdır.*

***Açar sözlər:*** *turizm sektoru, sosial investisiya, sosial sahələr, qiymətləndirmə metodu*

Sosial investisiya fəaliyyəti milli iqtisadiyyatın müxtəlif sahələrində fiziki və hüquqi şəxslərin praktik həyata keçirdikləri sosial sahələrə yönəli investisiya layihələri məcmusudur. İnvstisiya olaraq investor fond bazarında xüsusu statusa malik pul vəsaitlərindən, bank depozit əmanətlərindən, aksiyalardan, zayomlardan , veksel və digər qiymətli kağızlardan, tərpənən və tərpənməz əmlaklardan (maşın mexanizm, binalar, qurğular), maddi və intellektual dəyərlərdən, müəlliflik hüququ almış ixtiralardan, kəşflərdən, layihə və konstruktor işlərindən, torpaq sahəsindən və digər təbii ehtiyyatlardan (investorun mülkiyyətinə məxsus olan) və müəyyən dəyər ifadə edən digər vasitələrdən istifadə edə bilər. Sosial layihələrin tələblərinə uyğun olaraq investisiya fəaliyyəti, investisiya niyətli araşdırmalar, layihələrin işlənməsi, investisiyalaşdırma mənbələrinin müəyyənləşdirilməsi və müqavilə münasibətlərinin yaradılması, tikinti və qurğuların təşkili və onun fəaliyyət mexanizminin təmin edilməsi kimi elementlərdən ibarətdir.

İstənilən kapital qoyuluşunun əsas ideyası bu yatırımın effektivliyinin hesablanaraq əsaslandırılmasıdır. Burada əsas məsələlərdən birinin bu ideyanın həyata keçirilməsi üçün çəkilən cari xərclərin, gələcək gəlirlərin hansı tərtibdə qapanmasıdır. Bu sualın cavabı istər dövlət, istərsə də şəxsi investorların hər birini düşündürür. İnvestisiya fəaliyyətinin effektivliyi (cəlbediciliyi) göstəricilərinin hesablanması və bunun üçün üsullar, metodlar sistemi investisiya analizinin əsas nəzəri əsasını təşkil edir.

Dünya təcrübəsi bunun üçün bir çox sayda üsul və vasitələr əldə etmişdir ki, bunlar genişlənərək hər yerdə, o cümlədən respublikamızda tətbiq edilməyə başlanmışdır. Bu metodları üç qrupa bölmək olar:

1) Daxilolmaların korrelyasiya əmsalının (müsbət axın) xərclərlə (mənfi axın) müqaisə edilməsi ilə investisiya effektivliyinin hesablanması. Ənənəvi üsul.

2) Mühasibat hesabatlarının aparılması üsulu ilə effektivliyin hesablanması

3) Pulun zaman dəyəri nəzəriyyəsinə əsaslanan üsulla investisiya effektivliyinin hesablanması

*Yeni qiymətləndirmə metodlarından biri də müasir xalis gəlirlər metodudur.*

Bu üsul təmiz müasir qiymətlər anlayışına əsaslanır (Net Present Value).

$$NPV=CF_0+\frac{CF_1}{(1+r)^1}+\frac{CF_2}{(1+r)^2}+\frac{CF_3}{(1+r)^3}+\ldots+\frac{CF_n}{(1+r)^n}=\sum_{k=1}^{n}\frac{CF_k}{(1+r)^k}$$

*Burada* ,

$CF_i$ ($i=\overline{1,n}$) – təmiz pul axını,

r- layihə investisiyasına cəlb edilən kapital dəyərini ifadə edir.

Burada “xalis” termini aşağıdakı mənaya malikdir, pul axını məbləği daxil olan (müsbət) və çıxan mənfi məbləğlər axınının cəbri cəmi kimi müəyyən edilir. Məsələn hər hansı bir turizm layihəsinin icrasının ikinci ili üçün kapital qoyuluşu 15. 000$ -dur, həmin il üçün pul gəlirləri 12. 000$ təşkil edirsə, onda pul vəsaitinin xalis gəliri ikinci il üçün 3. 000$ təşkil edir [2, s. 167-169].

Müasir qiymətləndirmə metodunun mahiyyətinə görə bütün pul daxilolmaları layihənin reallaşdırılmasını şərtləndirən kapital qoyuluşunun müasir xərclər ( çıxış) axını ilə müqaisə edilir. Birinci və ikinci arasındakı fərq, təmiz müasir dəyəri müəyyənləşdirir. Azərbaycan Respublikasının mövcud qanunvericiliyində investisiya fəaliyyətinə aid investisiya layihəsinin həyata keçirilməsi üçün təşkilati-iqtisadi mexanizm müəyyənləşdirilib. İnvestisiya

fəaliyyəti haqqında Azərbaycan Respublikasının qanun Azərbaycan Respublikasının ərazisində investisiya-fəaliyyətinin (sərmayədarlığın) ümumi sosial, iqtisadi və hüquq şərtlərini müəyyənləşdirir.

Qanun investisiyanın Azərbaycan Respublikası iqtisadiyyatının intensiv cəlb olunmasına, ondan ölkənin sosial-iqtisadi bazasının, habelə beynəlxalq iqtisadi əməkdaşlığın və inteqrasiyanın inkişafı üçün səmərəli istifadə edilməsinə yönəldilmişdir və mülkiyyət formasından asılı olmayaraq bütün investorların hüquqlarının bərabər müdafiəsinə təminat verir [1].

"İnvestisiya fəaliyyətinin təşkilati və iqtisadi mexanizmi konsepsiyasına görə turizmə investisiya qoyuluşuna aşağıdakı kimi tərifini vermək olar:

Turizmdə investisiya fəaliyyətinin təşkilati-iqtisadi mexanizmi. Bu dövlət orqanları, investorlar, turizm müəssisələri və digər maraqlı şəxslər arasında qarşılıqlı əlaqə yaratmaq üçün iqtisadi mexanizmlər, alətlər, formalar və üsullar şəklində turizm sahəsində, dövlətin üstün maraqlarının tam şəkildə və ayrı-ayrı regionalar üzrə fəaliyyətinin bu mexanizmə uyğunluğunu təmin edən əlaqəli alt sistemlərin (komponentlırin) məcmusudur [2].

Turizm sahəsində investisiya fəaliyyətinin təşkilati-iqtisadi mexanizminin ayrı-ayrı elementlərini aşağıdakı kimi qruplaşdırmaq olar.

| Turizm sahəsində investisiya fəaliyyəti iştirakçıları | İnvestisiya fəaliyyəti mexanizminin təşkilati-iqtisadi elementləri |
|---|---|
| Dövlət hakimiyyəti təşkilatları | İnvestisiya fəaliyyətinin normativ-hüquqi təminatı, maliyyə-kredit fəaliyyəti, sanksiyalar və güzəştlər təhlükəsizlik siyasəti və s. |
| İnvestorlar | Kredit siyasəti, turizm müəssisələri kapitalında iştirak, müəssisənin idarə edilməsində iştirak və s. |
| Turizm sahəsi müəssisələri | Planlaşdırma və proqnozlaşdırma, investisiya fəaliyyəti təşkilatları, qiymətləndirmə, ayrı-ayrı turzim növlərinin inkişafı üzrə investisiya səmərəliliyinin təhlili |

Turizm investisiyalarının təşkilati-iqtisadi mexanizminin formalaşması və fəaliyyətinin səmərəliliyi əsasən iki vacib məqama əsaslanır-ayrı-ayrı obyektlərin investisiya cəlbediciliyi (istiqamət) investisiya yatırımı (turizm növləri, sərgi obyektləri, turizm destinasiyası və s. ) və investisiya prioritetləri. Turizm investisiyaları 1950-ci ildən sonra inkişaf etməyə daha çox başlamış, dünya müharibələrindən sonra gedən iqtisadi inkişaf turizmə də təsir etməyə başlamışdır. Xüsusi ilə françayzinq və ortaq investisiya şəklində turizm inkişaf etməyə başladı [3, s. ]

Turizmin inkişafının təhlili göstərir ki, turizm sahəsində investisiya fəaliyyəti sektorlararası və regionlararası xarakterə malikdir, belə ki, bir çox investisiya obyektinin fəaliyyət göstərməsi iqtisadiyyatın bir çox sektorunun (yeyinti, içki, bank, pərakəndə satış və s. ) fəaliyyətlərinin inteqrasiyasından asılıdır, həmçinin turizm obyektləri kimi investisiya obyektləri tez-tez bir bölgədən kənara çıxırlar, çünki onlar regional bir yanaşma əsasında deyil, mövcud tarixi-mədəni, coğrafi və digər xüsusiyyətlər əsasında qurulurlar. Müasir iqtisadiyyatımızda turizm sahəsinə investisiya qoyuluşu real investisiya şəklində həyata keçirilir. Belə ki, sərmayə qoyuluşu malların, işlərin, xidmətlərin, tikinti və obyektlərin yenidən qurulmasına xidmət edir. Aşağı yatırım sərhədinə malik olduqlarına görəturoperator və turaqent biznesi investorlar üçün daha cəlbedicidir. Bəs yerləşdirmə və digər daşınmaz əmlak obyektlərinə ayrılan investisiyalar haqqında nə demək mümkündür?! Yerləşmə investisiyaları turizm regionunun mərkəzində, əlverişli mövqedə yerləşən 4-5 ulduz kateqoriyalı mehmanxanaların tikintisinə sərmayə qoyuluşudur. Həmçinin 3 ulduz və daha aşağı kateqoriyalı otellər üçün geriyə ödəmə müddəti kommersiya, daşınmaz əmlak, tikintisahələrə ayrılan müddətə nisbətən daha az nəzərdə tutulur. Bildiyimiz kimi, dövlətin daxili və gəlmə turizminin inkişafı üçün geniş planların icrasını həyata keçirir. Lakin icazə-razılaşma prosedurunun çətinliyi və daşınmaz əmlakın ağırlığıbəzən turizm sahəsinin investisiyaqoyuluşuna marağı azalda bilir.

Turizm investisiya fəaliyyətinin planlaşdırılmasında və həyat keçirilməsində məqsədli idarəetmə sisteminə böyük ehtiyac vardır. Məqsədli idarəetmə ideyası müəllifi (Management By Objectives) Peternəzəriyyənin əsas müddəalarını "The Practice of Management" (1954) kitabında dərc etdirmiş və bu kitab sonralar dəfələrlə dərc edilmişdir.

Ölkəmizdə turizm sahəsində xərclərin idarə edilməsi konsepsiyası hələ kifayət qədər geniş yayılmamışdır. Məqsədli idarəetmə sistemini həyata keçirməyə başlayan şirkətlər olmuş lakin uğur əldə edə bilməmişlər. Onların mənfi təcrübəsinin nəticələrini təhlil edərkən aydınlaşır ki, qarşılarına aydın hədəf standartları və performans kriteriyalarıqoymamışlar: Onların müəyyən etdikləri hədəf standartları və turizm sahəsi müəssisələrinin sahibləri və investorlarının hədəfləri arasında müəyyən uyğunsuzluqlar vardır. Belə ki, investisiya fəaliyyətinin planlaşdırılmasında məqsədli idarəetmə sisteminin tətbiqi zamanı turizm sahəsinin xüsusiyyətlərinin nəzərə alındığını özündə əks etdirən elmi əsaslı metodologiyaların olması vacibdir.

Turizm sektorunda investisiya fəaliyyətinin planlaşdırılmasında və həyata keçirilməsində məqsədli idarəetmə sisteminin zəruriliyi Azərbaycan Respublikasında turizmin inkişafı haqqında qanununda və digər normativ hüquqi sənədlərlə əks olunur .

Sənədlərdə turizmin inkişafı üçün hədəf göstəricilərlə yanaşı, turizmə investisiya qoyuluşlarının səmərəliliyinin göstəricilərinə də diqqət yetirilir. Mövcud sənədləri və real investisiya layihələrinin təhlili-

nə əsaslanaraq turizm sahəsində investisiya səmərəliliyinin qiymətləndirilməsi üçün göstəricilər sistemi İnvestisiya idarəçiliyinin səmərəliliyini qiymətləndirərkən, əsas göstəriciləri həm büdcə vəsaitlərinin, həm də özəl investorların vəsaitlərinin səmərəli istifadəsinin monitorinqi üçün həm fərdi investorlara görə, həm də turistlərin hədəflərinə uyğun olaraq prioritet hesab olunan obyektlərin ərazinin turistik səviyyəsinə və destinasiyalara görə yenidən bölüşdürülməsi üçün qruplaşdırılmışdır.

Müasir turizm sektoru dünya iqtisadiyyatının ən yüksək gəlirli və dinamik inkişaf edən sahələrindəndir. Onun payına müxtəlif mənbələrə görə ümumi məhsulun 6-11%-i, qlobal investisiyaların 7%-i, hər 16 iş yerlərindən biri, istehlak xərcləri 11%-i, bütün vergi gəlirlərinin 5%-i düşür. Turizm bölgəsindən asılı olaraq ölkəyə gələn hər 20-30 tuist birbaşa və iki dolayı iş yerinin yaranmasına kömək edir. Turizmin illik sabit artımı 8-10% təşkil edir ki, bu da turizmlə məşğul olan mütəxəssislərin fikrinə görə "pis deyil, lakin kifayət də deyil".

Turizm infrastrukturuna investisiyaların cəlb edilməsi üçün bu sahənin xüsusiyyətlərini nəzərə alsaq, turizm sahəsinin obyektlərində investisiya fəaliyyətini stimullaşdıran təşkilati-iqtisadi mexanizmləri elmi əsaslar üzərində qurulmalı olduğu qənaətinə gələrik. İnvestisiyaların təsərrüfatçılıq təcrübəsinə aktiv daxil edilməsi Azərbaycanda turizm sənayesinin infrastrukturunun inkişafına mühüm töhfə verə bilər.

**Cədvəl 1: Turizm mehmanxana və mehmanxana tipli müəssisələrdə gecələmələr və yerləşdirilmiş şəxslərin sayı**

| **Göstərici** | **2010** | **2011** | **2012** | **2013** | **2014** | **2015** | **2016** |
|---|---|---|---|---|---|---|---|
| **Gecələmələr üçün çarpayı-sutka təqdim edilmişdir** (*vahid*) | 1358286. 0 | 1504312. 0 | 1640863. 0 | 1674065. 0 | 1687457. 0 | 1644056. 0 | 2125266. 0 |
| **Ölkə vətəndaşlarına təqdim edilmiş gecələmələr üçün çarpayı-sutka**(*vahid*) | 790230. 0 | 830501. 0 | 837774. 0 | 852513. 0 | 884908. 0 | 685117. 0 | 719002. 0 |
| **Əcnəbilər və vətəndaşlığı olmayan şəxslərə təqdim edilmiş gecələmələr üçün çarpayı-sutka** (*vahid*) | 568056. 0 | 673811. 0 | 803089. 0 | 821552. 0 | 802549. 0 | 958939. 0 | 1370264. 0 |
| **Ölkə vətəndaşlarının sayından uşaqlara təqdim edilmiş gecələmələr üçün çarpayı-sutka** (*vahid*) | 39642. 0 | 39653. 0 | 36274. 0 | 33861. 0 | 43845. 0 | 49452. 0 | 46938. 0 |
| **Yerləşdirilmiş şəxslərin sayı** (*nəfər*) | 438479. 0 | 510162. 0 | 624924. 0 | 666348. 0 | 672345. 0 | 838145. 0 | 1122068. 0 |
| **Yerləşdirilmiş şəxslərin sayında ölkə vətəndaşları** (*nəfər*) | 226123. 0 | 252175. 0 | 252807. 0 | 270887. 0 | 279555. 0 | 342497. 0 | 345284. 0 |
| **Yerləşdirilmiş şəxslərin sayından əcnəbilər və vətəndaşlığı olmayan şəxslər** (*nəfər*) | 212356. 0 | 257987. 0 | 372117. 0 | 395461. 0 | 392790. 0 | 495648. 0 | 776784. 0 |
| **Yerləşdirilmiş ölkə vətəndaşlarından uşaqların sayı** (*nəfər*) | 12883. 0 | 9537. 0 | 10602. 0 | 13920. 0 | 13063. 0 | 17451. 0 | 18331. 0 |

**Mənbə:** Azərbaycan Respublikası Statistika Komitəsinin rəsmi saytı, https://www. stat. gov. az/source/tourism/

Cədvəldə son illər üzrə turistlərin axınıöz əksini tapır. Turizm sənayesi üçün səmərəli idarəetmə sistemi yaratmaq investisiyalar sahəsində idarəetmə qərarlarının elmi bazasını yaratmaq və idarəetmə sisteminin əsas elementlərinin prinsiplər, üsullar, idarəetmə funksiyaları və zəruri nəticələrə və səmərəlilik səviyyəsinə nail olmaq üçün investisiya layihələrinin həyata keçirilməsinə yönəldici vasitələr kimi qarşılıqlı əlaqələrin təmin edilməsidir. Bu şərait turizm biznesində milli iqtisadiyyatın sahibkarlıq subyektlərinə investisiya qoyuluşu prosesinin idarə edilməsi üçün belə bir mexanizmin formalaşmasına zərurəti müəyyənləşdirir. Burada əsas məqsəd isə həm strateji aspektdən, həm də yaxın gələcəkdə investisiya layihəsində həyata keçirilməsi nzərdə tutulan işlərin reallaşdırılmasını təmin etdirməkdir. Eyni zamanda turizm sahəsində investisiyaların idarə edilməsinin nəticəli olması, investisiya ayrımları hesabına sahibkarların imtiyazlı kreditləşdirilməsi, milli iqtisadiyyat obyektlərinə investisiyaların cəlb edilməsinin təmin edilməsi, yerli və xarici investorlar üçün maliyyə kredit təşkilatları, institusional investorlar tərəfindən kiçik depozit fondlarının yığılmasını asanlaşdırır. Turizmin inkişafı birbaşa bu sahəyə dövlət dəstəyinin səviyyəsindən asılıdır.

Böyük turoperatorlarının təcrübəsi göstərir ki, səmərəli marketinq proqramınının qurulması və doğru strategiyanın tətbiqi etibarlı tərəfdaşları seçmək və satışları əhəmiyyətli dərəcədə artırmaq baxımından çox vacibdir. Ümumiyyətlə, turizmə investisiya cəlb etmək üçün aşağıda adları qeyd olunan bir neçə mühüm mexanizmlər tələb olunur.

1. İqtisadi rifah rejiminə malik turizm və rekreasiya fəaliyyətinin prioritet inkişafınının təmin ediləcəyi xüsusi zonalarının (ərazilərinin) təşkil edilməsi. Hal-hazırda bu zonalardan bir neçəsi artıq Naxçıvanda (Duz dağı), Naftalanda (Neft vannası) və Siyəzəndə (Qaraaltı) yenidən qurularaq turistlərin istifadəsinə verilmişdir.

2. İnvestisiya layihələrinin (obyektlərin tikintisi) həyata keçirilməsi ilə məşğul olan ixtisaslaşmış şirkətlərini, agentliklərin şəhər (rayon) ərazisində formalaşdırılması: investisiya prosesinin təşkili; buraya maliyyə resurslarının cəlb edilməsi; tikinti üçün torpaq sahələrinin ayrılması, lazımi icazə sənədlərinin alınması; investorlar və sahibkarlar üçün zəruri mühəndislik infrastrukturu ilə təchiz edilməsi, dizayn və tikinti işlərinin təşkili.

**Cədvəl 2: Tikinti əsas kapitala investisiyalar**

| **Göstərici** | **2010** | **2011** | **2012** | **2013** | **2014** | **2015** | **2016** |
|---|---|---|---|---|---|---|---|
| | | | | | | | |
| **Bütün maliyyə mənbələri hesabına əsas kapitala investisiyalar** (*min manat*) | 9905665. 8 | 12799061. 3 | 15407274. 4 | 17850815. 7 | 17618601. 1 | 15957028. 2 | 15772825. 8 |
| **Dövlət mülkiyyətinə məxsus müəssisə və təşkilatlar üzrə əsas kapitala investisiyalar** (*min manat*) | 6000899. 0 | 7924918. 1 | 9420640. 0 | 10647434. 5 | 9126744. 3 | 5816207. 8 | 5250271. 7 |
| **Qeyri-dövlət mülkiyyətinə məxsus müəssisə və təşkilatlar üzrə əsas kapitala investisiyalar** (*min manat*) | 3904766. 8 | 4874143. 2 | 5986634. 4 | 7203381. 2 | 8491856. 8 | 10140820. 4 | 10522554. 1 |
| **Məhsul istehsalı obyektlərinin tikintisinə yönəldilmiş investisiyalar**(*min manat*) | 4821024. 8 | 6033002. 7 | 7187757. 7 | 8781648. 6 | 10225173. 7 | 9948195. 7 | 12347275. 8 |
| **Xidmət sahələri üzrə obyektlərin tikintisinə yönəldilmiş investisiyalar**(*min manat*) | 5084641. 0 | 6766058. 6 | 8219516. 7 | 9069167. 1 | 7393427. 4 | 4978223. 9 | 2666160. 3 |
| **Əsas kapitala yönəldilmiş xarici investisiyalar** (*min manat*) | 2406492. 4 | 2600083. 0 | 3258917. 9 | 4671947. 7 | 4903627. 8 | 6898513. 5 | 9282549. 5 |
| **Neft sektoruna yönəldilmiş investisiyalar** (*min manat*) | 2958491. 7 | 3070236. 0 | 3854477. 8 | 5094617. 8 | 5959403. 1 | 7137136. 8 | 8648028. 6 |
| **Qeyri-neft sektoruna yönəldilmiş əsas kapitala investisiyalar** (*min manat*) | 6947174. 1 | 9728825. 3 | 11552796. 6 | 12756197. 9 | 11659198. 0 | 8819891. 4 | 7124797. 2 |
| **Əhalinin hər nəfərinə düşən investisiyanın həcmi** (*manat*) | 1108. 7 | 1413. 8 | 1679. 1 | 1920. 1 | 1871. 3 | 1674. 5 | 1636. 6 |
| **Əsas kapitala yönəldilmiş daxili investisiyalar** (*min manat*) | 7499173. 4 | 10198978. 3 | 12148356. 5 | 13178868. 0 | 12714973. 3 | 9058514. 7 | 6490276. 3 |

**Mənbə:** Azərbaycan Respublikası Statistika Komitəsinin rəsmi saytı, https://www. stat. gov. az/source/construction/

Cəvəldə son illərdə həyata keçirilən ivestisiya yatırımlarının miqdarı əks edilmişdir. İnvestisiyaların idarə edilməsi prosesi düşünülmüş və məqsədyönlü nizamlama fəaliyyətidir Bu proses maliyyə, maddi və intellektual dəyərlərə aid olub biznes obyektlərinə və digər fəaliyyətlərlə istiqamətlənmişdir. Azərbaycan Mədəniyyət və Turizm Nazirliyinin rəsmi məlumatına əsasən Azərbaycan üzrə yerləşmə (çarpayı çayı) 38000 təşkil edir. Bakı şəhərində isə 17900-ə bərabərdir. Bu isə 1 həftəlik gələn turist üçün cəmi 2 mln. turisti yerləşdirməyə kifayət edir. Digər turistlər yerləşmədə kənd evləri və həftəlik kirayə evləri təklif edilir. Bu baxımında Azərbaycanda gələn turistlərin yerləşdirilməsi üçün, yerləşdirmə yerlərinə xüsusiylə, 4 ulduzlu otellərə böyük ehtiyac vardır. Bu prosesin əsas tərkib hissəsi sahibkarlıq obyektlərinə və digər fəaliyyət növlərinə mənfəət (gəlir) əldə etmək və yaxud sosial səmərəyə nail olmaqdır. İnvestisiya fəaliyyətinin aktivləşdirilməsi üçün üç əsas amilin movcudluğu vacibdir:

a) İnvestisiya imkanları;
b) İnvestisiya niyyətləri;
c) Uyğun təşkilati struktur.

Bu baxımdan ilk olaraq Azərbaycan Respublikasının turizm baxımından SWOT Analizinə diqqət edək:

| **Güclü tərəflər** | **Zəif tərəflər** |
|---|---|
| ✓ Azərbaycan ərazisinin qədim tarixə, zəngin mədəni abidələrə, əlverişli coğrafi mövqeyə, cəlbedici təbiətə, folklora malik olması və müxtəlif dinlərin qovşağında yerləşməsi;<br>✓ turizmin inkişafına dövlət dəstəyinin olması;<br>✓ coğrafi məkan baxımından uyğun mövqedə yerləşməsi – Asiya, Avropa və Yaxın Şərq regionuna yaxın olması;<br>✓ irimiqyaslı beynəlxalq tədbirlərin keçirilməsində təcrübənin olması;<br>✓ qeyri-neft sektorunun inkişafında turizm sektorunun dövlət tərəfindən prioritet sektorlardan biri kimi müəyyən edilməsi. | ✓ turizm inkişafının artdığı bir dövrdə yetərli qədər yerləşdirmə imkanlarının olmaması;<br>✓ mövcud olan 3 və 4 olduzlu otellərdəki keyfiyyətin aşağı olması;<br>✓ turizm sahəsində kadr hazırlığının keyfiyyət və kəmiyyət baxımından əmək bazarının tələblərinə tam cavab verməməsi;<br>✓ turizm müəssisələrinin əsasən Bakı şəhərində təmərküzləşməsi;<br>✓ ölkənin regionlarında turizm informasiya mərkəzlərinin az olması;<br>✓ regionlarda xarici dillərdə sərbəst danışanların sayının nisbətən az olması;<br>✓ ölkə tanıtımının yetərincə təşkil olunmaması;<br>✓ turizm sektoru üzrə təhlillərin aparılması üçün statistik |

| | |
|---|---|
| | məlumat bazasının kifayət etməməsi;<br>✓ ölkəyə gələn xarici turistlərin məmnunluq səviyyəsinin ölçülməsi məqsədilə mütəmadi şəkildə monitorinqlərin keçirilməməsi. |
| **İmkanlar**<br>✓ işçi heyətin peşəkarlığının artırılması;<br>✓ yeni turizm xidmətlərinin yaradılması və inkişaf etdirilməsi;<br>✓ xarici və yerli turistlər üçün səyahət imkanlarının daha da asanlaşdırılması;<br>✓ ölkənin Naftalan nefti və Naxçıvan Muxtar Respublikasında yerləşən duz dağı kimi dəyərli sərvətlərə sahib olması;<br>✓ dövlət-özəl tərəfdaşlığı vasitəsilə özəl sektorun turizm sektoruna dəstəyi. | **Təhlükələr**<br>ölkənin geosiyasi mövqeyindən asılı olaraq yarana biləcək xarici təhlükələr. |

Uyğun təşkilati struktur təşkilatlar arasında idarəetmə əlaqələrini inkişaf etdirmək, layihələrinin icrasını asanlaşdıran maraqları və imkanları birləşdirmək qabiliyyətinə malik olmalıdır. Uğurlu qurulumuş turizm (ziyarəçilərin böyük axını sayəsində) bölgəyə xaricdən gələn gəlirləri və əlavə dövriyyəni təmin etməyə nail olur.

Turizm potensialının səmərəli inkişafı iki vacib zəmin olarsa mümkün olur:

1) Turistləri cəlb etmək üçün xüsusi, onların diqqətini cəlb edən, maraqladıran mühitinin mövcudluğu. Bəzi xüsusi məkan, muzey, nadir memarlıq abidəsi və yaxud xüsusi marağa xidmət edən hər hansı tədbir, idman yarışları və s. digər imkanlar;

2) Müştərilərə kifayət qədər yaxın olan yüksək imkan ziyarətçilərin böyük axının yaranmasına səbəb ola bilər.

Lakin hələ də zəruri potensiala malik bir çox regionlarda bunlardan kifayət qədər istifadə edilmir. Turizm infrastrukturunun az inkişafı və hərtərəfli turizm təklifinin olmaması səbəbindən çox sayda ziyarətçi olsa belə, turizm bölgəyə heç bir maddi gəlir gətirmir. Turistlər özləri ilə istirahət üçün zəruri olan hər şeyi gətirməli olurlar nəticədə gəldikləri yerlərə pul yox, yalnız zir-zibil qoyub çıxırlar. Türkiyə artıq bu tip yanaşmalar dövlət tərəfindən 2009-cu ildən etibarət təbliğat xarakterli marketinq tədbirləri ilə inkişaf etdirilməyə başlanılmışdır [7].

Mövcud turizm potensialının kompleks şəkildə inkişafı, turizm biznesinin və maraqlı tərəflərin bütün çoxsaylı iştirakçılarının nəticədə hər kəs üçün fayda gətirmək üçün ümumi bir konsepsiyanin qəbul edilməsi və birlikdə icra edilməsi yaranmış problemlırin birlikdə həll edilməsi üçün öz səylərini birləşdirmələri mürəkkəbləşir.

Lakin turizm potensilına malik bir çox bölgədə bu sahənin uğurlu inkişafı naminə ümumi planı hazırlana bilər. Bunu aşağıdakı planla həyta keçirmək mümkündür.

✓ Böyük kapital ayrımı tələb etməyən və tətbiqi asan və tez olan kiçik investisiya layihələri ilə praqmatik başlanğıc etmək,

✓ Bütün iştirakçıların, hər şeydən əvvəl kiçik sahibkarların, investisiyanın inkişafı konsepsiyasının hazırlanmasına və prosesin kordinasiyasında iştiraka cəlb edilməsi,

✓ Bir günlük və yaxud qısamüddətli tətilə gələn turistləri yaxınlıqda yerləşən böyük şəhərlərə istiqamətləndirilməsinə təmin edən təkliflərin hazırlanması,

✓ Turizm şirkətləri ilə reklam və əməkdaşlıq sahəsində birgə fəaliyyətə nail olmaq.

Turizmin planlı kompleks inkişafı istiqamətində tədbirlərə başlayarkən, turizmin müəssisələrin inkişafı, yeni iş yerlərinin yaradılması, ərazinin vergi potensialının artmasına və s. təsir göstərdiyini nəzərə alınmalıdır. Həmçinin turizm iqtisadi cəhətdən inkişaf etmiş bir ölkə kimi bölgənin imicini yaxşılaşdırır, tez bir zamanda investisiyanın geriyə ödənişini təmin edir.

Respublikanın bütün regionlarında və şəhərlərində, qüvvələrin turizmin inkişafına cəlb edilməsi yerli özünü idarəetmə orqanlarının da müvəfəqiyyət qazanmasına və yerli iqtisadiyyatın uğurlu inkişafına təminat yaradır. Turizm yalnız iqtisadi inkişafın bir seqmentidir, lakin bu sahənin bir çox iqtisadi sahələrlə qarşılıqlı fəaliyyətdə olması nəzərə alınarsa, ölkənin və bölgənin iqtisadiyyatının əsas və ən gəlirli istiqamətlərindən biri olması heç kəsdə sübhə doğurmaz.

Turizm dövlət və iş adamları arasında koordinasiya göstəricisi olduğundan turizm inkişafın iqtisadiyyatın inkişafındakı rolunun araşdırılması, turizmin regiondakı inkişaf dərəcəsi, yerli idarəetmə təşkilatları ilə köklü inkişaf potensialının əsas göstəricisi ola bilər. Turizm infrastrukturunun təkmilləşdirilməsi ilə bağlı problemləri həll etmək üçün öncə bütün fərdi sahibkarlarının və maraqlı təşkilatların iştirakını tələb edir. Bundan əlavə, yerli hakimiyyət orqanlarının əlaqələndirilməsi, bələdiyyə və regional dövlət təşkilatları arasında qarşılıqlı əməkdaşlıq fəaliyyətləri davamlı olmağı tələb edir. Bu baxımdan turizm kiçik və orta sahibkarlığın fəal dəstəklənməsinə təsirli stimul yaradır.

## Nəticə

Qeyd olunanalar o qənaətə gəlməyə imakan verir ki, turizmdə investisiya imkanları strategiyasının formlaşdırlmasının üç əsas istiqamət üzrə cəmləşməsi qəbulediləndir:

- Regionda və bələdiyyə ərazilərində inkişaf üçün razılaşdırılmış fəaliyyət proseslərində iştirakçıların rollarının müəyyənləşdirilməsi və fəaliyyətlərin paylanmasının həyata keçirlməsi,
- Reallaşdılmaq üçün təqdim edilmiş layihə və tədbirlərdən geriyə ödəmə dövrü ən az olan layihının birinci icra edilməsi,
- Peşəkar marketinq fəaliyyətinin təşkili.

Bir çox regionlarda turistləri cəlb edən bir sıra maraqlı turizm mərkəzləri fəaliyyət göstərir. Bununla yanaşı, bəzi çatışmazlıqlar mövcüddür ki, nəticədə turizm potensialından istifadə hələ də zəifdir və gözlənilən iqtisadi nəticələrin əldə edilməsinə gətirib çıxartmır. Azərbaycan bölgələri, görməli yerləri və tarixi abidələri sayəsində mühüm turizm potensialına malik ölkələr arasında yer almaqdadır. Müvafiq zəminin yaradılması, infrastrukturunun genişləndirilməsi və turizm xidmətlərinin kompleks paketinin hazırlanması ölkə iqtisadiyyatının büdcə formalaşdıran sektorlardan biri kimi turizmin formalaşdırılması üçün bir şərtdir. Bütün bunlar isə yalnız müəyyən bölgələrdə, turizmin hərtərəfli əsaslandırılmış, hədəflənmiş sərmayəsi ilə mümkündür.

## ƏDƏBİYYAT

1. İnvestisiya fəaliyyəti haqqında Azərbaycan Respublikasının qanun Bakı şəhəri, 13 yanvar 1995-ci il, № 952. 2. Anar Eminov, "Sosial sahəyə istiqamətlənmiş investisiya layihəsinin effektivliyi" monoqrafiya. Bakı, “Zərdabi LTD” MMC, 2017, 288 səh. 3. Doç. Dr. Ozan BAHAR, Prof. Dr. Metin KOZAK , “Turizm Ekonomisi” Eskişehir 2013, birinci nəşr, 201 səhifə. 4. Арнаутов Г. Л. “Совершенствование организационно-экономического механизма инвестиционной деятельности в промышленности (на примере пищевой отрасли). ” Автореферат диссертации. К. э. н. Киев. 2007.

https://www. stat. gov. az/source/tourism/, giriş tarixi 19. 01. 2018
https://www. stat. gov. az/source/construction/, giriş tarixi 21. 01. 2018
http://www. marka. org. tr/uploads/files/turizm_tesvikleri. pdf, giriş tarixi 19. 01. 2018
http://www2. cbu. edu. tr/yonetimekonomi/dergi/pdf/C14S22007/BT. PDF, giriş tarixi 19. 01. 2018

### Новые механизмы инвестирования в социальную сферу (в туристическом секторе)

А. Н. Эминов

Инвестиции в туристический сектор придают особый импульс осуществлению спортивных игр и других масштабных политических и спортивных событий в Азербайджане, созданию новых объектов руководством страны, развитию инфраструктуры существующих туристических центров и выставочных центров. Участники инвестиционной деятельности в сфере туризма связаны с процессом накопления, трансформации, размещения, инвестиционного инвестирования, целью которого является достижение максимальных положительных социально-экономических результатов на макро и микроуровнях в этом секторе. В этой статье основное внимание уделяется инвестированию в социальные сферы и продвижению инвестиций.

***Ключевые слова:*** *сектор туризма, социальные инвестиции, социальная сфера, метод оценки*

### New mechanisms for investing in social spheres (case of tourism sector)

A. N. Eminov

Investing in the tourism sector promotes a special impuls in sport and other large-scale political and sporting events in Azerbaijan, building new facilities, building infrastructure for tourism centers and shopping centers. Participants of the investment activity in the sphere of tourism connected with communication, transformation, construction, investigation investment proccesses, in order to get the most important social and economic investment consequences of macro-and micro-projects in the given sector. In this article, the main attention is given to emphasis investment in social spheres.

***Keywords:*** *tourism sector, social investments, social sphere, assesment method*

***a. eminov@atmu. edu. az***